**UOT.619:616.98:579.841.93-0973**

# DABAQ VƏ ONUNLA MÜBARİZƏ

**R.H.MURADOV , N.A.MUSTAFAYEVA, M.A.QARAYEVA**
**AKTN Baytarlıq Elmi Tədqiqat İnstitutu**

*Dabaq Kənd Təsərrüfatı heyvanlarının, xüsusən cütdırnaqlı heyvanların iti infeksion və şiddətli kantagioz xəstəliyi olmaqla süzülən viruslar tərəfindən törədilir. Xəstəlik mədə bağırsaq traktının , əsasən də ağız boşluğunun selikli qişasında vezikulyar zədələrin (aftaların), başın tüksüz sahələrində erroziyaların əmələ gəlməsi ilə xarakterizə olunur. Bəzi hallarda insanlarda xəstəliyə tutulurlar.*

***Açar sözlər**: dabaq xəstəliyi,virus,epizootologiya,profilaktika və müalicə.*

Heyvanlarda dabaq xəstəliyi ilk dəfə XV-ci əsrdə təsvir olunmuşdur. Dabağın virus təbiətli olması alman alimləri tərəfindən 1897-ci ildə müəyyən edilmiş, 1922-ci ildə isə Fransız alimləri virusun ilk dəfə iki müxtəlif tipini aşkar edərək onların O və A tipi olduğunu söyləmişlər. Hazırda bu xəstəliyi törədən bir çox tiplərin olması alimlər tərəfindən müəyyən edilmişdir. (A, O, S, Asiya-1, Asiya-2, $sat_{1,}$ $sat_{2,}$ $sat_3$). Bu tiplərin isə müxtəlif variantları mövcuddur. Bu tiplərin mahiyyəti ondan ibarətdir ki, hər tip yalnız özünə görə immunitet yaratmaq qabiliyyətinə malikdir.

Göstərilən tiplərin öz immunobioloji xüsusiyyətləri kəskin surətdə bir-birindən fərqlənməsinə baxmayaraq onların əmələ gətirdikləri xəstəlik klinik əlamətlərinə, gedişinə, patoloji- anotomik dəyişikliklərinə və xəstəliyin başqa xüsusiyyətlərinə görə bir-birindən fərqlənmirlər.

Xəstəliyin yüksək kontagioz olması, bir çox heyvan növlərinin həssaslığı, çoxsaylı immunobioloji tiplərin və yarımtiplərin mövcudluğu uzun müddət virusun xarici mühitdə və orqanizmdə qalması kimi mühüm amillər sanitariya işərinin aparılması üçün ciddi problemlər yaratmaqla, dövlətlər arasında iqtisadi əlaqələrin genişlənməsinə mane olur, ölkələrə böyük iqtisadi ziyan verir. Ciddi karrantin tədbirlərinin aparılmasına və həssas heyvanların peyvəndlənməsinə külli miqdarda vəsait tələb olunur.

Aparılan tədqiqatlar nəticəsində müəyyən edilmişdir ki, hər hansı bir ərazidə dabaq baş verdikdə yaşlı heyvanlar arasında tələfat az olsada onların ət və süd məhsuldarlığı əsaslı surətdə azalır. Dabağa tutulmuş heyvanlar çəkilərini itirməklə laktasiya dövründə bir daha əvvəlki məhsuldarlığına qayıtmır. Cavan heyvanlardan quzular, buzovlar və çoşqaların kütləvi halda tələfatına səbəb olur.

Dabağın A ,O v S tipləri dünyanın əksər ölkələrində qeyd olunmasına baxmayaraq sat-1,sat-2,sat-3 Afrika qitəsində, Azərbaycanda isə 1974, 1983 və 2002-ci illərdə Asiya-1 tipi epizootiya şəklində müşahidə edilmişdir.

Aparılan tədqiqat işləri ilə müəyyən edilmişdir ki, O tipinin 13, A tipinin 32, S tipinin 5, Sat-1in 7,Sat-2 nin 3, Sat-3 ün 4, Asiya -1in isə 2 Serovariantı vardır. Son zamanlar yarımtiplərdən xeyli fərqlənən ştamlar aşkar edilməsinə baxmayaraq onların fərqləri ayrı-ayrı yarımtiplərin göstəricilərinə tam cavab vermədiyindən yarımtip kimi göstərməmişdir. Statistik hesabatlara görə dünyada O tipi 38% çox, A tipi 33%, S tipi isə 26 % xəstəlik törədə billir.

Dabağın virusu başqa viruslara nisbətən fiziki, kimyəvi təsirlərə və xarici mühitin başqa amillərinə davamlıdır. Belə ki, virus öz virulentliyini yun parçada, duzlanmış ətdə 28 gün, qaramalın tükündə 49 gün, yunda 56 dan 105 günə kimi, otda 140 gün , kəpəkdə 40 günə kimi, 30 sm qalınlığında peyin təbəqəsi altında virus davamlılığını 6 gün, peyin şirəsində 39 gün, bulaq sularında 103gün saxlayır.

Dabaq virusu otlaqda iyul və avqust aylarında 1-7 gün sentyabr-oktyabr aylarında 3-20 gün, noyabr-dekabr aylarında və bütün qış ayları konservləşib qalır.

Mənfi temperatur virusu konservləşdirir. 50 dərəcə müsbət temperaturda 30 dəqiqə, 60 dərəcə temperaturda 5-15 dəqiqə, 100 dərəcədə isə dərhal onun tərkibi parçalanır. Dabaq xəstəliyinə təkdırnaqlılardan başqa 14 dəstəyə,33 ailəyə, 105 növə mənsub ev və vəhşi cütdırnaqlı heyvanlar yoluxurlar.

Təbii şəraitdə xəstəliyə daha çox qaramal, camışlar, qoyunlar, donuzlar, nisbətən az dəvələr, sonra marallar yoluxurlar.

Zoopark şəraitində dabaq xəstəliyinə zürafələr, antiloplar,vəhşi buğalar, Zebu, yaklar, dağ keçisi, cüyür, fil və başqaları tutulur.

Ümumiyyətlə infeksion xəstəliklərin əmələ gəlməsi və yayılmasında əsas rezervuar xəstə heyvanlar hesab olunur. Xəstə orqanizmdən virus xarici mühitə ağız suyu, süd, sidik və kal vasitəsi ilə ifraz olunur. Xəstə orqanizmdən virus xarici mühitə ağız suyu, süd, sidik və kal vasitəsi ilə ifraz olunur. Təcrübələrlə sübut olunub ki, xəstəliyə tutulmuş heyvan hələ xəstəlik əlamətini göstərmədən m

Azərbaycanda xəstəliyin baş verməsi üçün həmişə təhlükə vardır, ona görə ki, ölkəmiz dabağa görə uzun illər qeyri-salamat olan dövlətlərin əhatəsində olduğuna görə burda xəstəliyin baş verməsi üçün həmişə təhlükə vardır. Azərbaycanda heyvandarlığın inkişafı ilə əlaqədar onu bildiririk ki, heyvandarlıq bizim şəraitdə köçəri xarakterlidir. Belə ki, heyvanlar (xüsusən qoyunçuluq təsərrüfatları) yay dövründə yaylaqlara, qış dövründə isə qışlaqlara köçürülür. Ona görə də dabağın baş verməsi və yayılması şərait olduğu üşçün yüksək riskli zonaya aid edilir.

Hər bir dövlət müstəqil Dövlətlər Birliyi tərəfindən qəbul edilmiş baytarlıq üzrə 12 aprel 2001-ci il tarixdə keçirilən Hökumətlərarası Şuranın qərarı ilə bəyənilmiş qaydalar əsasında heyvanların dabaq xəstəliyinin profilaktikası və ona qarşı mübarizə tədbirləri haqqında nümunəvi qaydalar tərtib edərək rəhbərlik üçün qəbul edilmişdir. Həmin qaydalar dabaq xəstəliyinə qarşı mübarizə aparmaq üçün təstiq olunmuş təlimat əsasında tərtib olunmuşdur. Hər bir dövlət ərazisinin qorunmasını dövlətin “ Baytarlıq Qanunu “ na və onun icrası məqsədilə hazırlanan qaydalara və digər sənədlərə uyğun tənzimləyir.

Azərbaycan respublikasının Rusiya federasiyası ilə 390 km, Ermənistanla 1007km, Gürcüstanla 480 km, İranla 765 km, Türkiyə ilə 15 km-lik sərhəddi vardır. Respublikanın Şərq Sərhəddi 713 km-lik uzunluğunda Xəzər dənizi ilə əhatə olunmuşdurr.

Statistik məlumatlara görə Azərbaycanda bir əsr bundan əvvəl də dabaq xəstəliyi olmuşdur.1957-ci ilədək dabağın tipi müəyən edilməmiş qalırdı. Həmin illərdən etibarən respublikamızda xəstəliyin tipi müəyyən edilmişdir. Uzun illər bizim təsərrüfatlarda dabağın O tipinun $O_1$ variantı, Atipinin $A_7$ və A-22yarımtipləri, Sat-1 və Asiya -1 tipləri olmuşdur. Adları qeyd olunan tiplərdən Sat-1 tipi 50 ildən artıqdır ki, ərazilərimizdə qeydə alınmır.

Xəstəliyin patogenezi hələ yaxşı öyrənilməmişdir. Virusun orqanizmdə inkişaf etməsi mexanizmi haqda bir çox bir-birinə zidd fikirlər vardır. Bir sıra müəlliflər qeyd etmişlər ki, virus bu və ya digər yolda orqanizmə daxil olandan sonar qana keçib, əvvəlcə qanda inkişaf edir. Bundan sonar başqa toxumlara yayılmaqla selikli qişalarda və dəridə dabaq aftaları inkişaf edir.

Dabaq xəstəliyinə həssas olan bütün heyvanlarda, xəstəlik gözə çarpan xarakterli klinik əlamətlərlə gedir ki, bu əlamətləri adi klinik müayinələr ilə müəyyən etmək mümkün olur. Cavan heyvanlarda xəstəlik çox hallarda mürəkkəb gedişə malikdir.

Xəstəliyin diaqnostikası epizotoloji məlumatlara, klinik əlamətlərə, pataloqoanatomiki dəyişikliklərə və laborator müayinələrə əsasən qoyulur.

Dabaq baş verdikdə virusun tipini və serovariantını təyin etməyin infeksiyanın tez bir zamanda yerində ləğv edilməsi, yayılmasının qarşısının alınması üçün vacib şərtlərdəndir.

Dabaq virusunun tiplərinin bir-birindən fərqləndirməsi üçün son zamanlar çox əlverişli, sadə və tez başa gələn seroloji (komplementin birləşmə reaksiyası- KBR) üsulla tipləşdirmə qaydası öyrənilmişdir.

Dabaq xəstəliyində qoyulan KBR-sı digər xəstəliklərdə qoyulan reaksiyadan onunla fərqlənir ki, burada müayinə olunan materialda əks cisim yox, antigen axtarılır. Əgər bruselyozun müayinəsində heyvanın qan serumunda istifadə edilirsə, dabaq xəstəliyində əldə hər tipin özü üçün təklikdə pozitiv( hiperimmun) serum olmaqla müyinə üçün dabaq aftasından alınmış toxumanın 10%-li emulsiyasından istifadə edilir. Bu zaman müayinə olunan virusun hansı tip serrumla reaksiya verməsi müəyyən edilir.

Ümumiyyətlə belə demək mümkündürsə, bu xəstəliyə diaqnopz qoymaq o qədər də çətin deyildir. Xəstəliyin ildırım surəti ilə yayılması, klinik əlamətlərinə əsasən heyvandarlıq işçiləri xəstəliyə diaqnoz qoya bilirlər. Mütəxəssislər isə xəstəliyin tipini müəyyən etməklə ona qarşı mübarizəni təşkil etməlidirlər. Çünki xəstəliyin tipi laborator müayinələrinə əsasən qoyulur.

Respublikamızın ərazisində asiya-1 tipi ilə xəstəlik hadisəsi keçən əsrdə 2 dəfə epizootiya halında müşahidə edilmişdir. Əvvəlcə bu xəstəlik 1974-cü ildə Cəlilabad rayonunda bir məntəqədə, 1983-cü ildə isə əksər rayonlarda müşahidə edilmişdir. Xəstəliyin A, O, Asiya-1 tipinin respublika ərazisinə İran və Türkiyədən keçməsini və heyvandarlığın köçəri olmasını nəzərə alaraq 1983-cü ildən etibarən ölkə ərazisində mövcud iribuynuzlu heyvanlar polyvalent A, O, asiya -1 vaksini ilə , xırda buynuzlu heyvanlar isə A, O polivalent vaksini ilə təlimata uyğun il ərzində 2 dəfə peyvənd edilir. Nəzərə almaq lazımdır ki, xırda buynuzlu heyvanlar Asiya-1 tipi ilə xəstələnmir, lakin Asiya-1 tipini yaya bilir.

Müstəqil Dövlətlər Birliyinin baytarlıq üzrə 12 aaprel 2001-ci il tarixdə keçirilən Hökumətlər rası Şuranın qərarı əsasında heyvanların dabaq xəstəliyinin profilaktikası və ona qarşı mübarizənin nümunəvi qaydalarında aşağıda göstərilənlər nəzərdə tutulmuşdur.

1. Ümumi qaydalar;
2. Dövlət ərazisinə dabaq virusunun keçməsinin qarşısını almaq üçün tədbirlər;
3. Heyvanlarda xəstəlik olduqda və xəstəliyə şübhə yarandıqda görülən tədbirlər;
4. Dabaq məntəqələrinin ləğv edilməsi üsulları;
5. Qeyri-sağlam məntəqələrdə və dabaq məntəqəsində aparılan tədbirlər;
6. Təhlükəli zonada aparılan tədbirlər;
7. Bufer zonada aparılan tədbirlər;

8. Karrantinin götürülməsi və sonrakı məhdudlaşdırıcı tədbirlər.

Bu tədbirlərlə bərabər dabağa qarşı mübarizə tədbirlərinə dair təsdiq olunmuş təlimatı rəhbər tutaraq ölkə ərazisində xəstəliyin baş verməsinin qarşısı alına bilər.

Beynəlxalq Epizootik Büronun Baytarlıq Kodeksinə uyğun olaraq 3 kompleks epizootiya əleyhi tədbirlərdən istifadə edilməsi vacibdir. Bunlardan birincisi baytarlıq-sanitariya tədbirlərinin aparılması, ikincisi- yoluxmuş naxırın , sürünün məhv edilməsi (kəsimi), digəri isə vaksinoprofilaktikasıdır. Bu üsulların tətbiqi konkret epizootiki vəziyyətə uyğun aparılır.

Bu üsulların hər birinin müsbət və mənfi tərəfləri vardır. Məsələn baytarlıq -sanitariya üsulu çox böyük həcmli olmaqla iktisadi cəhətdən xeyli miqdarda xərc tələb edir, ona görə də təsərrüfata tətbiqi baha başa gəlir. Baytarlıq-sanitariya tədbirlərinə əməl etmədikdə isə xəstəlik geniş miqyasda yayılır. Yoluxmuş naxırın məhv edilməsi ilə bərabər baytarlıq-sanitariya tədbirlərinə əməl olunması çox effektli və radikal üsuldur, üstün cəhəti onun birbaşa xəstəlik mənbəyinin məhv edilməsinə yönəlmişdir. ABŞ-da , Kanadada, Böyük Britaniyada və başqa dövlətlərdə yüksək effektli olmuşdur.

Dabaq tiplərinin çoxluğu onun yoluxma yolunun müxtəlifliyi, həssas heyvanların növlərinin kifayət qədər olması dabaqla mübarizənin əsas problemlərindədir. Dabaq əleyhinə tədbirlərin təşkilinin respublika ərazisundə riskli zonaya daxil olduğunu nəzərə alaraq xeyli miqdarda çətinliklər törədir. Mövcud mal-qaranın peyvəndi üçün vaksin əldə etmək üçün külli miqdarda vəsait tələb olunur.

Respublikamızda dabağa qarşı mübarizənin əsasını başqa tədbirlərlə yanaşı vaksinoprofilaktika təşkil edir.

Dabaq xəstəliyinin ilk klinik əlamətləri heyvanlarda iştahanın pozulması, südün azalması, bədən hərarətinin yüksəlməsi, ağızda (dodaq, dil, dişlərin dibi, damaq) qabarcıqların əmələ gəlməsi , ağızdan selikli mayenin axması ilə başlayır. Qabarcıqlar partladıqdan sonar onların yerində yaralar əmələ gəlir. Belə yaralar və qabarcıqlar heyvanların dırnaq tacında, dırnaqların arasında, bəzi hallarda isə yelində və əmcəklərdə baş verir.

**Xəstəliyin yayılması:** -Xəstəliyin əsas mənbəyi dabağa tutulmuş heyvanlardır. Xəstəliyin törədicisi əsasən xəstə heyvanların ağız suyu, sidiyi, nəcisi, südü, əti, yunu, dərisi və başqa məhsulları ilə ətrafa yayılır.

Xəstəliyi törədən viruslar heyvan orqanizminə ən çox ağız boşluğundan , bəzi hallarda isə dəri , gözün selikli qişası, dırnaq arası sahə,xarici tənasül orqanları və s. yollarla da daxil ola bilir.

**Xəstəliyin müalicəsi və ona qarşı aparılan mübarizə tədbirləri: -**Yaşayış məntəqələrində olan ayrı-ayrı təsərüfatlarda dabaq xəstəliyini vaxtında aradan qaldırmaq üçün xəstə heyvanları müalicə etməkdən başqa onların yemləndirilməsi və bəslənməsi şəraiti, habelə yemlərin keyfiyyətini yaxşılaşdırmaqla karrantin tədbirlərinə ciddi yanaşmaq lazımdır.

Xəstə heyvanları gün ərzində 3-4 dəfə bir vedrə soyuq suya 1qr göy daş əlavə edib verməli. Ağız boşluğunda olan yaraların tez bir zamanda sağalması üçün yara olan yerləri kalium-permanqanatın zəif məhlulu ilı zəy və 1%-li göy daş məhlulu ilə gün ərzində 2-3 dəfə yumaq lazımdır. Bu məqsədlə sirkə turşusunun zəif mıəhlulundan (1l suya 0,5 xörək qaşığı təmiz sirkə turşusu) və ya digər dezinfeksiya edici dərman maddələrindən istifadə etmək yaxşı nəticə verir. Zədələnmiş dırnaqları mexaniki təmizlədikdən sonra, onları 1%-li formalin məhlulu ilə yumalı və bərabər miqdarda qətranla balıq yağı qarışığı, sintometsin emulsiyası, streptosid mazı, naftalan nefti və digər bakteiosit təsirə malik olan emulsiyalarla müalicə etmək lazımdır.

Bizim uzun illər xəstəliyin müalicəsində tətbiq etdiyimiz paraformin 1l ılıq suda hazırlanmış 0,5-0,8%-li məhlulundan istifadə olunması çox yüksək nəticə vermişdir. Xəstə heyvanın ağız boşluğunda əmələ gələn yaraları həmin məhlul ilə gün ərzində 3-4 dəfə yumaq və həmin məhlul ilə heyvan saxlanılan tövlələri dezinfeksiya etməklə xəstələrn tezliklə müalicə olunmasına nail olmaq olar.

Heyvanlarda dabaq və oxşar xəstəliklər baş verdikdə, bu heyvanları təcili surətdə naxırdan, sürüdən ayırmalı, baytar həkimə tez xəbər verməli və təssərrüfatda dabağa həssas olan bütün heyvanlar virusun hansı tip olduğunu, yəni virusun tipini təyin etməklə həmin tipə qarşı olan dabaq vaksini ilə peyvənd edilməlidir. Xəstəliyin yayılmasının qarşısını almaq üçün xəstəlik baş vermiş yaşayış məntəqəsində karranrin elan edilməlidir.

Ümumiyyətlə xəstəlik baş verdikdə rəhbər orqanlar (Respublika Nazirlər Soveti, rayon icra hakimiyyəti orqanları, bələdiyyələr, kənd təssərrüfatı orqanları, kənd qəsəbə icra nümayəndələri ) lazımi qaydada karrantin qoyulana kimi, yoluxucu xəstəliyin yayılmasının qarşısını almaq və onu aradan qaldırmaq üçün dırhal lazımi tədbirlər görməlidirlər.

Xəstəlik baş vermiş rayon (şəhər) rəhbərliyi nəzərdə tutulan qaydada, qeyi-sağlam məntəqəni onun sərhəddini, təhlükəli zamanı göstərməklə karrantin qoyulması və epizootiya əleyhi fövqəladə komissiya yaradılması barədə sərəncam verir və xəstəliyin ləğvinə dair tədbirlər planını təstiq edir. Dabaq xəstəliyi baş verən zaman baytarlıq qanunçuluğu əsasında karrantin şərtlərinə ciddi surətdə əməl edilməlidir, əks halda xəstəlik epizootiya halında yayıla bilər.

Ümumiyyətlə respublikamızın ərazisində dabağa qarşı mübarizə tədbirlərinin aparılmasında vaksino-profilaktikadan geniş surətdə istifadə olunur.Belə ki, bizim şəraitdə heyvandarlıq əsasən köçəri şərait-də olduğundan xüsusən davarlar və heyvandarlıq işçilərinə məxsus iri buynuzlu heyvanlarında davarlarla birlikdə yay otlaqlarını və sonra qışlaqlara köçürüldüyündən daimi olaraq heyvanlar təlimat əsasında vaksinlərlə peyvənd edilməlidir.

Uzun illərin təcrübəsi göstərir ki, iri buynuzlu heyvanlar dabağa qarşı polivalent vaksinlə hey-vanlar qışlama dövrünü başa vurub otarğı sahələrinə çıxarılan vaxt yəni mart ayının sonu aprel ayının əvvəllərində peyvənd olunarsa bütün yay dövrü heyvanlarda immunitet yarandığından xəstəlik hadisəsi baş vermir.Bu zaman nəzərə almaq lazımdır ki, cavan heyvanlar peyvənd edildikdən sonra onlarda üç ay müddətinə immunitet yaranır, yəni cavan heyvanlar (18 aylıqdan yaşınadək) hər üç aydan bir təkrar peyvənd (revaksinasiya) olunarsa immunitet zənciri pozulmaz.

Xırda buynuzlu heyvanlar yaylaqlara qaldırılmazdan əvvəl bivalent ( A, O tipinə) vaksinlə peyvənd olunduqdan sonra yay otlaqlarına qaldırılması təmin olunarsa ölkə ərazisində dabağın baş vermə riski olmaz.

Respublikanın Dövlət Baytarlıq Xidmətinin idarə etmə orqanı tərəfindən epizootiki vəziyyəti əsas tutaraq dabaq əleyhi tədbirlər planı hazırlamalıdır, bundan başqa profilaktiki baytar – sanitar və digər tədbirlərin əsas istiqamətlərini eyni zamanda tədbirə məsul şəxsləri təyin edir.

Dövlət ərazisinə dabaq virusunun keçməsinin qarşısını almaq üçün ölkəyə gətirilən heyvanlar və baytarlıq xidməti orqnlarının nəzarəti altında olan yüklərin və nəqliyyat vasitələrinin baytarlıq cəhətdən işlənməsi bu qaydalarda göstərilən kimi və “ BEB – nin Beynəlxalq Baytarlıq Kodeksində” nəzərdə tutulan formada həyata keçirilir. Bir qayda olaraq ölkəyə gətirilən heyvanlar müəyyən olunmuş qaydada karantində saxlanılır. Bir heyvanda xəstəlik və ya xəstəliyə şübhə olduğu halda bütün gətirilən heyvanlar infeksiyanın yayılmaması məqsədilə yerində məhv edilir. Əgər qonşu dövlətlərdə dabaq xəstəliyi baş verərsə və xəstəliyin bilavasitə keçməsi təhlükəsi yaranarsa onda qəbul olunmuş qaydada epizootiya əleyhinə fövqəladə komissiya yaradılır. Bu komissiya ölkə ərazisinə dabağın keçməsinin qarşısını almaq məqsədilə tədbirlər planı hazırlayıb həyata keçirilməsini təşkil edir.

Dabağa qarşı profilaktiki peyvəndləmədə qonşu dövlətlərlə qarşılıqlı anlaşmanın oması, bu tədbirin eyni vaxtda birgə tətbiq edilməsi regionda dabağın baş verməsi riskini təminedə bilər.

**ƏDƏBİYYAT**

1.И.И.Лукашов. «Частная эпизоотология.»Москва-1961,стр.72. 2.Р.Ф.Сосова «.Епизоотология» Москва-1969,стр.147. 3.Ф.А.Терентьева,А.А.Маркова.»Инфекционные и инвазионные болезни крупного рогатого скота» Москва-1956.стр277-311. 4.А.А.Сидорчука.»Инфекционные болезни животных».Москва-Колос. 2007.стр.261-271. 5.K.Səfərov.”Xüsusi Epizootologiya” 1 hissə “Dabaq” 1990 səh .196-217. 6.E.A.Əliyev, İ.M.Əzimov, U.M.Vəliyev,N.V.Səfi. “Epizoologiya və infeksion xəstəliklər” Bakı-2013,səh.416-431.

**Ящур и меры борьбы**

**Р.Г.Мурадов, ,Н.А.Мустафаева , М.А.Гараева**

Нами изучена сезонная динамика ящура, клиническое течение на различных видах животных.Экспериментально доказана возможность скрытого течения ящура и репродукция ящура у буйволов и мелького рогатого скота при введении им небольших доз (100 МЛД 50/0,2 мл) вируса,не вызывающих клинических признаков. Считаем, что это является одним из механизмов сохранения в при роде его популяций, что необходимо

Учитывать при проведении эпизоотологических мониторингов и профилактики.

***Ключевые слова** : ящур, вирус, эпизоотология, профилактика и лечение.*

**Fott and mouth disease and struggle measures**

**RH.Muradov.N.A.Mustafayeva.M.A.Qarayeva**

We investigated seasonal dynamics of FMD. Clinical sings on various kinds of animal .We demonstrate the latent current FMD and its reproduction at buffalos sheep goats in experiments at introduction small dozes(100 ml D 50/0,2 ml) virus. There doses not produce clinical signs. We consider that it is one mechanisms of preservation of this virus in a nature. It is necessary to take into account at realization the epizootology monitoring.

**Key words:** murrain , virus, epizootology, prophylaxis and treatment,

.